ISSN: 2710-9960 (Print)
ISSN: 2710-8432 (Online)
JOURNAL OF "HISTORY OF SCIENCE"
Cild 2, Say 2, Sıra 4, 2021, 80-93

# NUMERİCAL DYNAMİCS AND ETHNİC COMPOSİTİON OF THE POPULATİON OF NAKHCHİVAN UYEZD (1849-1917 YEARS) (BASED ON RUSSİAN-LANGUAGE SOURCES)

**Ziyad Amrahov**[1]
UDC 93/94
KBT 63.3(0)51-52-53

**Keywords:**

Azerbaijan
Irevan province
Nakhchivan uyezd
Nakhchivan city
Tsarist russia
Population
Ethnic composition
Number dynamics

**ABSTRACT**

The article examines the population dynamics and ethnic composition of the population of Nakhchivan uyezd of Iravan province, which was one of the provinces of Azerbaijan during Tsarist Russia, from 1849 to 1917. Research shows that the Turkmenchay Treaty not only changed the geographical landscape of Azerbaijan, but Article 15 of the treaty had a very serious impact on the future ethnic landscape of most of its regions. Mass resettlements to the territories of the former Iravan and Nakhchivan khanates from both the Gajars and the Ottoman Empire led to demographic changes in the later Iravan province. These changes, which have manifested themselves in most parts of the province since 1850, were marked by ethnic cleansing towards the early twentieth century. In particular, the genocides committed by Armenian terrorist groups in the region in 1905-1906, as well as in the following period, led the local population to flee from one region to another. As a result, there was a sharp decline in the number of Tatars in some districts of the province, the number of Tatars, and a sharp increase in the number of foreigners and Armenians. However, Russian-language sources published in different years of the XIX-XX centuries confirm that the main ethnic group of the province, the numerical advantage, is still the Azerbaijani Turks (Tatars). We can clearly see this from the cameral notes of the central cities, uyezd centers, uyezds, districts, villages of the province, as well as the results of the census.

[1]. Doctor of Philosophy in History, Associate Professor, Head of the Department of Historiography and Source Studies of Institute of History of Science of ANAS
zamrahov@gmail.com
https://orcid.org/0000-0001-6853-3311
*Received: 19.05.2021*
*Accepted: 07.06.2021*

# NAXÇIVAN QƏZASI ƏHALİSİNİN SAY DİNAMİKASI VƏ ETNİK TƏRKİBİ (1849-1917-Cİ İLLƏR) (RUSDİLLİ MƏNBƏLƏR ƏSASINDA)

**Ziyad Əmrahov**[1]
UOT 93/94
KBT 63.3(0)51-52-53

**Açar sözlər:**

Azərbaycan
İrəvan quberniyası
Naxçıvan qəzası
Naxçıvan şəhəri
Çar rusiyası
Əhali
Etnik tərkib
Say dinamikası

**ANNOTASİYA**

Məqalədə çar Rusiyası dövründə Azərbaycanın quberniyalarından biri olan İrəvan quberniyasının Naxçıvan qəzasının 1849-cu ildən 1917-ci ilədək əhalisinin say dinamikası, etnik tərkibi araşdırılır. Aparılan araşdırmalar göstərir ki, Türkmənçay müqaviləsi Azərbaycanın təkcə coğrafi mənzərəsini dəyişdirmədi, müqavilənin 15-ci maddəsi isə onun əsasən, əksər bölgələrinin gələcək etnik mənzərəsinə çox ciddi təsir etdi. Keçmiş İrəvan və Naxçıvan xanlıqlarının ərazilərinə kütləvi şəkildə həm Qacarlar, həm də Osmanlı imperiyasından köçürülmələr sonradan yaradılmış İrəvan quberniyasında demoqrafik dəyişikliyiklərə gətirib çıxardı. Quberniyanın əksər bölgələrində 1850-ci ildən özünü göstərən bu dəyişikliklər XX əsrin əvvəllərinə doğru etnik təmizləmə ilə müşahidə olundu. Xüsusilə, 1905-1906-cı illər, eləcə də sonrakı dövr ərzində erməni terrorçu dəstələrinin bölgədə soyqırımlar törətməsi, yerli əhalinin bir bölgədən digər bölgəyə qaçmasına gətirib çıxarmışdı. Nəticədə quberniyanın bəzi qəzalarının, qəza şəhərlərinin yerli əhalisinin, tatarların sayında kəskin azalma, gəlmələrin, ermənilərin sayında isə kəskin artma müşahidə olunurdu. Bununla belə, XIX-XX əsrin müxtəlif illərində işıq üzü görmüş rusdilli mənbələr quberniyanın əsas etnosunun, say üstünlüyünün yenə də Azərbaycan türkləri (tatarlar) olduğunu təsdiqləyir. Bunu biz quberniyanın mərkəzi şəhərləri, qəza mərkəzləri, qəzaları, mahalları, kəndləri üzrə kameral təsvirlərdən, eləcə də əhali siyahıyaalınmasının nəticələrindən aydın şəkildə görə bilərik.

[1]. Tarix üzrə fəlsəfə doktoru, dosent, AMEA Elm Tarixi İnstitutunun Tarixşünaslıq və Mənbəşünaslıq şöbəsinin müdiri
zamrahov@gmail.com
https://orcid.org/0000-0001-6853-3311
*Məqalə redaksiyaya daxil olmuşdur: 19.05.2021*
*Təkrar işlənməyə göndərilmişdir: 30.05.2021*
*Çapa qəbul edilmişdir: 07.06.2021*

ISSN: 2710-9960 (Print)
ISSN: 2710-8432 (Online)
JOURNAL OF "HISTORY OF SCIENCE"
Cild 2, Say 2, Sıra 4, 2021, 80-93

# ЧИСЛЕННАЯ ДИНАМИКА И ЭТНИЧЕСКИЙ СОСТАВ НАСЕЛЕНИЯ НАХЧЫВАНСКОГО УЕЗДА (1849-1917 ГГ.) (НА ОСНОВЕ РУССКОЯЗЫЧНЫХ ИСТОЧНИКОВ)

**Зияд Амрахов**[1]

УДК 93/94
КВТ 63.3(0)51-52-53

**Ключевые слова:**

Азербайджан
Иреванская губерния
Нахчыванский уезд
Город нахчыван
Царская россия
Население
Этнический состав
Динамика численности

## АННОТАЦИЯ

В статье исследуется динамика населения и этнический состав населения Нахчыванского уезда Иреванской губернии, одной из провинций Азербайджана во времена царской России, с 1849 по 1917 год. Исследования показывают, что Туркменчайский договор не только изменил географический облик Азербайджана, также статья 15 договора оказала очень серьезное влияние на будущее этническое восприятие большинства его регионов. Массовые переселения на территории бывшего Иреванского и Нахчыванского ханств как из Гаджаров, так и из Османской империи привели к демографическим изменениям в более поздней Иреванской губернии. Эти изменения, которые проявились в большей части провинции с 1850 года, были отмечены этническими чистками в начале двадцатого века. В частности, геноцид, совершенный армянскими террористическими группировками в регионе в 1905-1906 годах, а также в последующий период, вынудил местное население бежать из одного региона в другой. В результате резко сократилось количество татар в некоторых районах губернии, количество татар и резко увеличилось количество иностранцев и армян. Однако русскоязычные источники, опубликованные в разные годы XIX-XX веков, подтверждают, что основной этнической группой провинции, численным преимуществом, по-прежнему были азербайджанские тюрки (татары). Это видно из камеральных описаний центральных городов, уездных центров, уездов, районов, сел губернии, а также по результатам переписи населения.

[1]. Доктор философии по истории, доцент, Заведущий отделом Историографии и Источниковедения Института Истории Науки НАНА
zamrahov@gmail.com
https://orcid.org/0000-0001-6853-3311

## GİRİŞ

### XIX əsrin ikinci yarısında Naxçıvan qəzasının əhalisinin say dinamikası və etnik tərkibi

1849-cu ildə yaradılmış İrəvan quberniyasının əsasını təşkil edən ilk qəzalardan biri də Naxçıvan qəzası idi. Naxçıvan qəzası əhalisinin sayı, etnik tərkibi ilə bağlı ilk məlumatlar 1853-cü ilə aiddir. 1853-cü ildə Sankt-Peterburqda işıq üzü görmüş "Rusiya imperiyasının hərbi-statistik icmalı"nın 16-cı cildinin 6-cı hissəsi olan "İrəvan quberniyasının icmalı"nın məlumatlarına görə, Naxçıvan şəhərində 1.334 ailə qeydə alınmışdı ki, bu ailələrdə də 4.410 nəfər yaşayırdı. Bunlardan 2.447 nəfəri tatar (1.322 nəfər kişi, 1.125 nəfər qadın), 1.963 nəfəri erməni (1.022 nəfər kişi, 941 nəfər qadın), idi.[1]Naxçıvan şəhərində fərdi evlərin sayı 1.100, dövlət mülkiyyətində olan evlərin sayı 3 idi.[2]

Naxçıvan qəzası Naxçıvan sahəsində 3280 ev, 11.433 əhali var idi ki, bunlardan da 5.879 nəfər kişi, 5.554 nəfəri qadın idi. Naxçıvan qəzası üzrə evlərin sayı 4.524 idi. Dərələyəzdə ümumi əhali 9.137 nəfər idi ki, bunun da 6.214 nəfəri daimi (3.212 nəfəri kişi, 3.002 nəfəri qadın), 2.923 nəfəri köçəri (1.610 kişi, 1313 qadın) idi.[3]Əhalinin milli tərkibinə görə, 12.889 nəfəri tatar (6.716 kişi, 6.173 qadın), 7.681 nəfəri erməni (3.985 kişi, 3.696 qadın) idi.[4] Dərələyəz sahəsində 1.244 ev var idi. Naxçıvan qəzası üzrə əhalinin sayı 25.000 nəfər idi.[5]

1853-cü il məlumatlarından sonra Naxçıvan qəzası əhalisi ilə bağlı məlumatlar 1873-cü ilə aid göstəricilər əsasında Tiflisdə 1879-cu ildə nəşr olunmuş "Qafqaz haqqında məlumatlar toplusu"nun 5-ci cildinin 1-ci hissəsində əksini tapmışdır.

1873-cü il məlumatlarına görə, İrəvan quberniyasına daxil olan Naxçıvan qəzasında Yurdçu-Gidasar (26 ev, 104 kişi, 45 qadın, tatar, şiə), Qabullu (12 ev, 54 kişi, 33 qadın, tatar, şiə), Qıvrax (Kəngərli, 88 ev, 415 kişi, 311 qadın, tatar, şiə), Şahtaxtı (91 ev, 393 kişi, 381 qadın, tatar, şiə), Qarabağlar (80 ev, 429 kişi, 305 qadın, tatar, şiə: 8 ev, 20 kişi, 12 qadın, tatar, sünni: 3 ev, 10 kişi, 8 qadın, kürd, sünni), Böyük-düz (-), Aznavyurt (82 ev, 425 kişi, 419 qadın, erməni, qriqoryan: 20 ev, 83 kişi, 75 qadın, tatar, şiə), Xincab (19 ev, 76 kişi, 77 qadın, tatar, şiə), Sust (61 ev, 387 kişi, 229 qadın, kürd, sünni: 10 ev, 61 kişi, 65 qadın, tatar, şiə), Naxçıvançay hövzəsində: Horadiz (65 ev, 341 kişi, 270 qadın, erməni, qriqoryan), Ağ-xaç (14 ev, 82 kişi, 58 qadın, tatar, şiə: 15 ev, 72 kişi, 52 qadın, erməni, qriqoryan), Ses (43 ev, 159 kişi, 138 qadın, erməni, qriqoryan), İtqıran (40 ev, 152 kişi, 105 qadın, tatar, şiə), Ohbun (16 ev, 64 kişi, 40 qadın, tatar, şiə: 10 ev, 26 kişi, 31 qadın, erməni, qriqoryan), Dığın-Almalı (40 ev, 238 kişi, 220 qadın, erməni, qriqoryan), Buzqov (29 ev, 132 kişi, 116 qadın, tatar, şiə), Lizbirt (10 ev, 51 kişi, 39 qadın, tatar, şiə), Sultan-bəy (74 ev, 333 kişi, 330 qadın, erməni, qriqoryan), Gərməçatax (13 ev, 79 kişi, 52 qadın, tatar, şiə), Cəhri (344 ev, 1200 kişi, 893 qadın, tatar, şiə: 145 ev, 477 kişi, 409 qadın, erməni, qriqoryan), Nəzər-abad (61 ev, 219 kişi, 198 qadın, erməni, qriqoryan), Diduvar (25 ev, 81 kişi, 57 qadın, tatar, şiə), Xinzirək (Xanzirək, 8 ev, 34 kişi, 20 qadın, tatar, şiə), Karmalinovka (13 ev, 42 kişi, 43 qadın, rus, molakan: 18 ev, 68 kişi, 68 qadın, rus, duxob: 1 ev, 3 kişi, 3 qadın, rus, subb.), Zarnatun (5 ev, 39 kişi, 32 qadın, tatar, şiə), Gümür (74 ev, 371 kişi, 310 qadın, erməni, qriqoryan), Gicazur (37 ev, 233 kişi, 219 qadın, erməni, qriqoryan), Mağara-qışlağı (26 ev, 112 kişi, 50 qadın,

[1] Военно-статистическое обозрение Российской империи. 1837-1854. Том 16. Кавказский край. Эриванская губерния. СПб. 1853. s. 187.
[2] Yenə orada, s. 192.
[3] Yenə orada, s. 187.
[4] Yenə orada.
[5] Yenə orada.

tatar, şiə), Əli-Məmməd-qışlağı (12 ev, 56 kişi, 30 qadın, tatar, şiə), Kolanı-qışlağı (27 ev, 145 kişi, 83 qadın, tatar, şiə), Nurs (Nors, 69 ev, 383 kişi, 314 qadın, erməni, qriqoryan), Nurs-Məzrə (22 ev, 143 kişi, 118 qadın, erməni, qriqoryan), Mahmud-abad (20 ev, 63 kişi, 42 qadın, tatar, şiə), Qarababa (19 ev, 97 kişi, 87 qadın, erməni, qriqoryan), Keçili (23 ev, 124 kişi, 84 qadın, tatar, şiə), Kilis-Kəngərli (58 ev, 195 kişi, 106 qadın, tatar, erməni), Şahbuz (50 ev, 230 kişi, 153 qadın, tatar, şiə), Siçancıq (5 ev, 38 kişi, 24 qadın, tatar, şiə), Zirnel (17 ev, 50 kişi, 35 qadın, tatar, şiə), Kükü-Kəngərli (29 ev, 88 kişi, 77 qadın, tatar, şiə), Yuxarı İrameşin (29 ev, 78 kişi, 68 qadın, tatar, şiə), Aşağı İrameşin (23 ev, 47 kişi, 47 qadın, tatar, şiə), Qızıl-qışlaq (4 ev, 10 kişi, 6 qadın, tatar, şiə), Arınc (34 ev, 157 kişi, 105 qadın, erməni, qriqoryan), Badamlı (49 ev, 257 kişi, 237 qadın, erməni, qriqoryan: 17 ev, 75 kişi, 75 qadın, tatar, şiə), Qaraboya (13 ev, 50 kişi, 57 qadın, tatar, şiə), Şaddı (11 ev, 48 kişi, 30 qadın, tatar, şiə), Salalus (25 ev, 97 kişi, 79 qadın, tatar, şiə), Taylaxlı (16 ev, 75 kişi, 45 qadın, tatar, şiə), Maralıq (13 ev, 73 kişi, 48 qadın, tatar, şiə), Tirkeş (28 ev, 179 kişi, 122 qadın, tatar, şiə), Vayxır (24 ev, 88 kişi, 57 qadın, tatar, şiə), Xalxal (60 ev, 193 kişi, 127 qadın, erməni, qriqoryan), Kərbəlayi-Oruc (15 ev, 53 kişi, 41 qadın, tatar, şiə), Mama-Rza-diza (27 ev, 85 kişi, 59 qadın, erməni, qriqoryan: 14 ev, 36 kişi, 38 qadın, tatar, şiə ), Kül-təpə (88 ev, 284 kişi, 269 qadın, erməni, qriqoryan), Alagöz-Məzrə (51 ev, 192 kişi, 140 qadın, erməni, qriqoryan: 1 ev, 6 kişi, 4 qadın, rus, pravaslav), Yuxarı Uzun-oba (32 ev, 96 kişi, 94 qadın, erməni, qriqoryan: 22 ev, 76 kişi, 68 qadın, tatar, şiə), Aşağı Uzun-oba (67 ev, 219 kişi, 171 qadın, tatar, şiə), Xəlilli (Xəlil-abad, 35 ev, 88 kişi, 78 qadın, erməni, qriqoryan), Kərim-bəy (13 ev, 43 kişi, 51 qadın, erməni, qriqoryan), Şıx-Mahmud (125 ev, 370 kişi, 334 qadın, erməni, qriqoryan), Sərab (91 ev, 411 kişi, 293 qadın, tatar, şiə), Nəxşi-Nərgiz (5 ev, 23 kişi, 24 qadın, tatar, şiə), Kəqab (50 ev, 157 kişi, 80 qadın, tatar, şiə), Nəcəf-Əli-bəy (5 ev, 18 kişi, 16 qadın, tatar, şiə), Əlixanlı-Zeynəddin (67 ev, 250 kişi, 189 qadın, tatar, şiə), Yarımca (148 ev, 432 kişi, 357 qadın, tatar, şiə), Şahmiranşa (28 ev, 121 kişi, 106 qadın, tatar, şiə, Miranşah abidəsi), Bədəşhan (20 ev, 76 kişi, 64 qadın, tatar, şiə), Hacıvər (47 ev, 128 kişi, 139 qadın, erməni, qriqoryan), Şəkər-abad (23 ev, 77 kişi, 81 qadın, tatar, şiə), Qoşa-dizə (66 ev, 200 kişi, 170 qadın, tatar, şiə), Əli-abad (58 ev, 184 kişi, 161 qadın, erməni, qriqoryan), Qaraxan-bəyli (116 ev, 359 kişi, 316 qadın, erməni, qriqoryan), Qaracıq (89 ev, 419 kişi, 323 qadın, tatar, şiə), Bulqan (80 ev, 397 kişi, 326 qadın, tatar, şiə), Dumbul (142 ev, 381 kişi, 323 qadın, erməni, qriqoryan: 30 ev, 104 kişi, 82 qadın, tatar, şiə), Yamxana (107 ev, 338 kişi, 315 qadın, erməni, qriqoryan: 2 ev, 6 kişi, 5 qadın, tatar, şiə), Təzə-kənd (262 ev, 790 kişi, 670 qadın, erməni, qriqoryan: 61 ev, 178 kişi, 159 qadın, tatar, şiə), Kuznut (177 ev, 662 kişi, 543 qadın, erməni, qriqoryan: 14 ev, 40 kişi, 34 qadın, tatar, şiə), Abbas-Abad (-), Çeşmə-basar (-), Nehrəm (337 ev, 1014 kişi, 554 qadın, tatar, şiə, 3 məscid, İmam-zadə-Aqil abidəsi), Qızıl-vəng (-), Kərmir-vəng (8 ev, 23 kişi, 13 qadın, erməni, qriqoryan), Göynük (12 ev, 61 kişi, 28 qadın, tatar, şiə), Nahacir (28 ev, 137 kişi, 110 qadın, tatar, şiə: 1 ev, 4 kişi, 2 qadın, kürd, sünni), Sürməlik (12 ev, 46 kişi, 40 qadın, tatar, şiə), Xaçaparax (47 ev, 168 kişi, 97 qadın, tatar, şiə), Əlincə çay hövzəsində: Ləkətax (18 ev, 55 kişi, 38 qadın, tatar, şiə), Bəy-Əhməd (11 ev, 25 kişi, 17 qadın, tatar, şiə), Aransa (33 ev, 120 kişi, 75 qadın, tatar, şiə), Qazançı-Milaq (79 ev, 398 kişi, 318 qadın, erməni, qriqoryan: 37 ev, 115 kişi, 70 qadın, tatar, şiə), Zuvala (4 ev, 20 kişi, 11 qadın, tatar, şiə), Teyvəz (17 ev, 68 kişi, 53 qadın, tatar, şiə), Baş-Anzur (27 ev, 88 kişi, 44 qadın, tatar, şiə), Orta Anzur (5 ev, 14 kişi, 6 qadın, tatar, şiə), Aşağı Anzur (29 ev, 117 kişi, 54 qadın, tatar, şiə), Xanağa (50 ev, 267 kişi, 113 qadın, tatar, şiə), Noraşen (46 ev, 175 kişi, 114 qadın, tatar, şiə: 37 ev, 145 kişi, 123 qadın, erməni, qriqoryan), Naradaşt (28 ev, 213 kişi, 134 qadın, erməni, qriqoryan), Xoşkeşin (21 ev, 62 kişi, 26 qadın, tatar, şiə), Saltax (43 ev, 218 kişi, 107 qadın, tatar, şiə), Bənənyar (71 ev, 266 kişi, 160 qadın, tatar, şiə), Kirnə (54 ev, 210 kişi, 114 qadın, tatar, şiə), Abrakunis (68 ev, 288 kişi, 258 qadın, erməni, qriqoryan), Qızılca (11 ev, 55 kişi, 38 qadın, tatar, şiə: 5 ev, 13

kişi, 13 qadın, erməni, qriqoryan), Arazin (40 ev, 141 kişi, 98 qadın, tatar, şiə: 31 ev, 130 kişi, 96 qadın, erməni, qriqoryan), Camaldin (58 ev, 192 kişi, 122 qadın, tatar, şiə), Culfa (80 ev, 252 kişi, 223 qadın, erməni, qriqoryan), Şurut (38 ev, 253 kişi, 266 qadın, erməni, qriqoryan: 10 ev, 56 kişi, 41 qadın, tatar, şiə), Gəl-Caracur (15 ev, 90 kişi, 70 qadın, erməni, qriqoryan), Kirim-Qulu-dizə (23 ev, 119 kişi, 93 qadın, tatar, şiə), Yaycı (146 ev, 720 kişi, 572 qadın, tatar, şiə), Nürgüt (24 ev, 115 kişi, 71 qadın, tatar, şiə), Əlləgi (31 ev, 158 kişi, 124 qadın, erməni, qriqoryan), Nəsir-abad (18 ev, 104 kişi, 90 qadın, erməni, qriqoryan: 11 ev, 56 kişi, 30 qadın, tatar, şiə), Bist (67 ev, 328 kişi, 100 qadın, tatar, şiə: 40 ev, 280 kişi, 208 qadın, erməni, qriqoryan), Tivə (66 ev, 300 kişi, 159 qadın, tatar, şiə), Paraqa (44 ev, 358 kişi, 198 qadın, erməni, qriqoryan: 8 ev, 53 kişi, 28 qadın, tatar, şiə), Behrut (15 ev, 63 kişi, 42 qadın, tatar, şiə), Biləv (120 ev, 356 kişi, 280 qadın, tatar, şiə). Xudaverdi-bəy (17 ev, 58 kişi, 46 qadın, tatar, şiə), Subatan-dizə (18 ev, 58 kişi, 32 qadın, tatar, şiə), Hüseyn-Əli-bəy (7 ev, 13 kişi, 12 qadın, tatar, şiə), Mirzə-Həsən-dizə (11 ev, 26 kişi, 22 qadın, tatar, şiə), Der (61 ev, 254 kişi, 205 qadın, erməni, qriqoryan), Kələntər-dizə (13 ev, 30 kişi, 18 qadın, tatar, şiə), Yuxarı Aza (130 ev, 378 kişi, 321 qadın, erməni, qriqoryan: 4 ev, 19 kişi, 14 qadın, tatar, şiə), Aşağı Aza (40 ev, 102 kişi, 100 qadın, tatar, şiə: 13 ev, 59 kişi, 43 qadın, erməni, qriqoryan), Urmis (28 ev, 167 kişi, 167 qadın, erməni, qriqoryan), Məzrə (83 ev, 403 kişi, 210 qadın, tatar, şiə), Düglün (46 ev, 128 kişi, 109 qadın, tatar, şiə), Çinanab (76 ev, 443 kişi, 371 qadın, erməni, qriqoryan: 3 ev, 17 kişi, 12 qadın, tatar, şiə), Düylün-dizə (6 ev, 20 kişi, 13 qadın, tatar, şiə), Nazmərə (5 ev, 19 kişi, 5 qadın, tatar, şiə), Yunis (30 ev, 114 kişi, 50 qadın, tatar, şiə), Kələki (24 ev, 158 kişi, 99 qadın, erməni, qriqoryan), Dernis (63 ev, 205 kişi, 112 qadın, tatar, şiə), Lütvəli-Sultan-dizə (1 ev, 5 kişi, 2 qadın, tatar, şiə), Danagirt (58 ev, 239 kişi, 224 qadın, erməni, qriqoryan), Deksar (17 ev, 53 kişi, 42 qadın, tatar, şiə: 12 ev, 35 kişi, 20 qadın, erməni, qriqoryan), Sal (3 ev, 18 kişi, 5 qadın, tatar, şiə), Valaver (19 ev, 76 kişi, 46 qadın, tatar, şiə), Vənənd (115 ev, 374 kişi, 219 qadın, tatar, şiə), Cəfər-xan-dizə (6 ev, 14 kişi, 10 qadın, tatar, şiə), Ağrı (16 ev, 40 kişi, 32 qadın, tatar, şiə), Xanağa (36 ev, 120 kişi, 56 qadın, tatar, şiə), Dasta (198 ev, 716 kişi, 585 qadın, tatar, şiə), Nucdədə (21 ev, 92 kişi, 41 qadın, tatar, şiə), Varaqirt (49 ev, 296 kişi, 202 qadın, erməni, qriqoryan), Varagirt-Tatar (11 ev, 34 kişi, 21 qadın, tatar, şiə), Yuxarı Əylis (170 ev, 730 kişi, 473 qadın, erməni, qriqoryan), İkinci Yuxarı Əylis (54 ev, 279 kişi, 119 qadın, tatar, şiə), Aşağı Əylis (99 ev, 483 kişi, 397 qadın, erməni, qriqoryan), Mirzə-Cəfər-dizə (2 ev, 7 kişi, 3 qadın, tatar, şiə), Nüsnüs (39 ev, 103 kişi, 98 qadın, tatar, şiə), Yuxarı Əndməc (33 ev, 185 kişi, 92 qadın, tatar, şiə), Aşağı Andməc (18 ev, 90 kişi, 57 qadın, tatar, şiə: 19 ev, 53 kişi, 63 qadın, erməni, qriqoryan), Kənzə (26 ev, 115 kişi, 35 qadın, tatar, şiə), Anabat (8 ev, 22 kişi, 11 qadın, tatar, şiə), Ketəm (20 ev, 38 kişi, 59 qadın, tatar, şiə), Ordubad (-), Siar (-), Kilid (32 ev, 90 kişi, 68 qadın, tatar, şiə), Karçevan (35 ev, 184 kişi, 182 qadın, erməni, qriqoryan: 1 ev, 2 kişi, 2 qadın, rus, pravaslav) kəndləri var idi.[1]

1873-cü il məlumatlarına görə, Naxçıvan şəhərində 1.481 ev var idi. Şəhər əhalisinin sayı 6.877 nəfər idi ki, bunun da 3.720 kişi, 3.157 qadın idi. Etnik tərkibinə görə, Naxçıvan şəhərində tatarlar 4.697 nəfər (2.524 kişi, 2.173 qadın), ermənilər 2.157 nəfər (1.184 kişi, 973 qadın), ruslar 23 nəfər (12 kişi, 11 qadın) idi. Ordubad şəhərində evlərin sayı 840 idi. Şəhər əhalisinin sayı 3.489 nəfər (2.063 kişi, 1.426 qadın) idi ki, bunun da 3.153 nəfəri tatar (1.867 kişi, 1.286 qadın), 336 nəfəri erməni (196 kişi, 140 qadın) idi.[2]

---

[1] Сборник сведений о Кавказе. Т. 5. Списки населенных мест Кавказского Края. Ч. 1. Губернии Эриванская, Кутаисская, Бакинская, Ставропольская и Терская область. Под. ред. Главного ред. Кавказского Статистического Комитета Н.Зейдлица. Тифлис: Типография Управления Наместника Кавказского, 1879, с. 72-86.

[2] Сборник сведений о Кавказе. Т. 5. Списки населенныхь месть Кавказского Края. Ч. 1, s. 112.

1873-cü il məlumatlarına görə, Naxçıvan qəzasında 8.429 ev var idi. Qəza əhalisinin sayı 58.758 nəfər (33.547 kişi, 25.211 qadın) idi. Etnik tərkibinə görə, Naxçıvan qəzası əhalisinin 241 nəfəri rus (121 kişi, 120 qadın), 31.406 nəfəri tatar (18.616 kişi, 12.790 qadın), 26.471 nəfəri erməni (14.409 kişi, 12.062 qadın), 640 nəfəri kürd (401 kişi, 239 qadın) idi. Faiz nisbətinə görə, Naxçıvan qəzasında tatarlar 56,370%, ermənilər 41,120%, ruslar 0,760%, kürdlər 0,380% idi.[1]

Məlumatlardan göründüyü kimi, 1873-cü ildə Naxçıvan qəzasının əhalisi şəhərlər də daxil olmaqla 69.124 nəfər idi. Etnik tərkibinə görə, qəzada tatarlar 39.256 nəfərlə birinci yerdə, ermənilər 28.964 nəfərlə ikinci yerdə, kürdlər 640 nəfərlə üçüncü yerdə, ruslar 264 nəfərlə 4-cü yerdə idi.

1873-cü ildən sonra Naxçıvan qəzasının əhalisinin sayı, etnik, dini və sosial tərkibi, eləcə də demoqrafik dəyişiklikləri ilə bağlı məlumatlar 1886-cı il göstəriciləri əsasında 1893-cü ildə Tiflisdə nəşr olunmuş "Zaqafqaziya diyarının əhalisi haqqında statistik məlumatlar məcmuəsi"ndə əks olunmuşdur.

1886-cı il məlumatlarına görə, Naxçıvan şəhərində 1.494 evdə 3.753 kişi, 3.186 qadın, ümumilikdə 6.939 nəfər əhali yaşayırdı. Şəhərdə yaşayan əhalinin 4.836 nəfəri tatar (992 ev, 2.531 kişi, 2.305 qadın), 2.041 nəfəri erməni (483 ev, 1.185 kişi, 856 qadın), 24 nəfəri rus (9 ev, 16 kişi, 8 qadın), digərləri 38 nəfər (10 ev 21 kişi, 17 qadın) idi.[2]

Ordubad şəhərində 854 evdə 2.331 kişi, 1.868 qadın, ümumilikdə 4.199 nəfər əhali yaşayırdı. Şəhərdə yaşayan əhalinin 3.787 nəfəri tatar (769 ev, 2.100 kişi, 1.687 qadın), 411 nəfəri erməni (84 ev, 230 kişi, 181 qadın), 1 nəfəri rus (1 ev, 1 kişi) idi.[3]

Dini tərkibinə görə, 1886-cı il məlumatlarına əsasən, Naxçıvan şəhərində pravaslav məzhəbi 16 kişi, 8 qadın, erməni-qriqoryanlar 1.185 kişi, 856 qadın, müsəlmanlar: sünni -, şiələr: kişi 2.552, qadın 2.322, digər məzhəblər – idi.[4]Ordubad şəhərində pravaslav məzhəbi: 1 kişi, qadın -, sektantlar-, erməni-qriqoryanlar: 230 kişi, 181 qadın, müsəlmanlar: sünni-, şiələr: 2.100 kişi, 1.687 qadın, digər məzhəblər – idi.[5]

Sosial tərkibinə görə, Naxçıvan şəhərində mülkədar-zadəganlar -, bəylər: kişi 231, qadın 192, ruhanilər: erməni-qriqoryan kişilər 116, qadın 68, şiələr: kişi 8, qadın 6, fəxri vətəndaşlar-, tacirlər: kişi 111, qadın 106, şəhər sakinləri-, təqaüdçülər: kişi 8, qadın 3, kəndlilər: kişi 3.279, qadın 2.811 nəfər idi.[6]Sosial tərkibinə görə, Ordubad şəhərində mülkədar-zadəganlar -, bəylər: kişi 59, qadın 51, ruhanilər: erməni-qriqoryan kişilər 9, qadın 9, şiələr: kişi 13, qadın 9, fəxri vətəndaşlar-, tacirlər: kişi 17, qadın 20, şəhər sakinləri-, təqaüdçülər-, kəndlilər: kişi 2.233, qadın 1.779 nəfər idi.[7]

1886-cı il məlumatlarına əsasən, Naxçıvan qəzasının Əliabad polis sahəsində 2.939 ev var idi. Burada 10.195 kişi, 8.229 qadın, ümumilikdə 18.424 nəfər əhali yaşayırdı. Bunlardan 7.986 nəfər tatar (1.300 ev, 4.478 kişi, 3.508 qadın), 473 nəfəri kürd (64 ev, 294 kişi, 179 qadın), 9.965 nəfəri erməni (1.575 ev, kişi 5.427, qadın 4.538), idi.[8]

Naxçıvan qəzasının Cəhri polis sahəsində 2.101 ev var idi. Burada 9.352 kişi, 7.154 qadın, ümumilikdə 16.506 nəfər əhali yaşayırdı. Bunlardan 8.243 nəfəri tatar (1.179 ev, kişi 4.810, qadın 3.433), 8.099 nəfəri erməni (894 ev, 4.460 kişi, 3.639 qadın), 164 nəfəri rus (28 ev, 82 kişi, 82 qadın) idi.[9]

Naxçıvan qəzasının Abrakunis polis sahəsində 2.176 ev var idi. Burada kişilərin sayı 9.454 nəfər, qadınların sayı 7.102 nəfər, ümumilikdə isə 16.655 nəfər əhali yaşayırdı.

[1] Yenə orada, s.112-115.
[2] Свод Статистических данных о населении Закавказского края, извлеченных из посемейных списков 1886 г. Отд. 3-й. Города и уезды Эриванской Губернии.
[3] Yenə orada.
[4] Yenə orada.
[5] Yenə orada.
[6] Yenə orada.
[7] Свод Статистических данных о населении Закавказского края. Отд. 3-й. Города и уезды Эриванской Губернии.
[8] Yenə orada.
[9] Yenə orada.

Bunlardan 11.100 nəfəri tatar (1.514 ev, 6.356 kişi, 4.744 qadın), 5.555 nəfəri erməni (662 ev, 3.098 kişi, 2.457 qadın), idi.[1]

Naxçıvan qəzasının Yuxarı Əylis polis sahəsində 2.702 ev var idi. Burada kişilərin sayı 12.352 nəfər, qadınların sayı 8.945 nəfər, ümumilikdə 21.297 nəfər əhali yaşayırdı. Bunlardan 11.897 nəfəri tatar (1.660 ev, 7.121 kişi, 4.776 qadın), 9.399 nəfəri erməni (1.042 ev, 5.231 kişi, 4.168 qadın) idi.[2]

Naxçıvan qəzasında 9.918 ev var idi. Kişilərin sayı 41.353 nəfər, qadınların sayı 31.529 nəfər, cəmi 72.882 nəfər idi. Bunlardan 39.222 nəfəri tatar (5.653 ev tatar, 22.761 kişi, 16.461 qadın), 33.018 nəfəri erməni (4.173 ev erməni, 18.216 kişi, 14.802 qadın), 473 nəfəri kürd (64 ev, 294 kişi, 179 qadın), 165 nəfəri rus (28 ev, 82 kişi, 83 qadın), 4 nəfəri gürcü idi.[3]

1886-cı il məlumatlarından göründüyü kimi, Naxçıvan qəzasında da 4 polis sahəsi var idi. Bu polis sahələrindən yalnız birində, Əliabad polis sahəsində ermənilərin sayı tatarlardan üstün idi. Qəzanın digər 3 polis sahələrində Azərbaycan türkləri üstün idi. Ordubad və Naxçıvan şəhərləri də daxil olmaqla Naxçıvan qəzasının əhalisi 84.020 nəfər (12.266 ev, 47.437 kişi, 36.583 qadın) idi.

1886-cı ildən sonra Naxçıvan qəzasının əhalisinin sayı, etnik tərkibi, demoqrafik və sosial dəyişikliklərlə bağlı məlumatlar Rusiya imperiyasında 1897-ci ildə aparılmış ilk əhali siyahıyaalınmasında əksini tapmışdır.

1897-ci il məlumatlarına görə, Naxçıvan qəzasının əhalisi 100.771 nəfər (kişi cinsi 52.984 nəfər, qadın 47.787 nəfər) idi ki, bunun da 8.790 nəfəri (4.666 kişi, 4.124 qadın) Naxçıvan şəhərinin, 4.611 nəfəri (2.458 kişi, 2.153 qadın) Ordubad şəhərinin, 87.370 nəfəri isə qəzanın digər bölgələrinin payına düşürdü.[4]

Naxçıvan qəzasında qeydə alınan 100.771 nəfər əhalinin 96.480 nəfəri yerli, 1.173 nəfəri İrəvan quberniyasının digər qəzalarından olanlar, 1.612 nəfəri digər quberniyadan, 1.506 nəfəri isə digər dövlətlərdən olanlar idi. Naxçıvan şəhərinin 8.790 nəfər əhalisinin 7.689 nəfəri yerli, 490 nəfəri İrəvan quberniyasının digər qəzalarından, 337 nəfəri digər quberniyalardan, 274 nəfəri isə digər dövlətlərdən olanlar idi. Ordubad şəhərinin 4.611 nəfər əhalisinin 4.140 nəfəri yerli, 7 nəfəri İrəvan quberniyasının digər qəzalarından, 348 nəfəri digər quberniyalardan, 116 nəfəri isə digər dövlətlərdən olanlar idi.[5]

Sosial tərkibinə görə, Naxçıvan qəzasında zadəganlar 1.769 nəfər, ruhanilər 717 nəfər, tacirlər 143 nəfər, xırda tacirlər 10.168 nəfər, kəndlilər 85.637 nəfər, xaricilər 2.074 nəfər, digərləri 263 nəfər idi. Naxçıvan şəhərində zadəganlar 626 nəfər, ruhanilər 87 nəfər, tacir 1 nəfər, xırda tacirlər 6.027 nəfər, kəndlilər 1.503 nəfər, xaricilər 511 nəfər, digərləri 35 nəfər idi. Ordubad şəhərində zadəganlar 165 nəfər, ruhanilər 12 nəfər, tacir -, xırda tacirlər 3.766 nəfər, kəndlilər 499 nəfər, xaricilər 147 nəfər, digərləri 22 nəfər idi.[6]

1897-ci il məlumatlarına görə, Naxçıvan qəzasında ruslar 1.014 nəfər, ermənilər 34.672 nəfər, kürdlər 639 nəfər, yəhudilər 4 nəfər, tatarlar 64.151 nəfər, aysorlar 9 nəfər, digərləri 282 nəfər idi. Naxçıvan şəhərində ruslar 232 nəfər, ermənilər 2.263 nəfər, kürdlər 2 nəfər, yəhudilər, tatarlar 6.161 nəfər, aysorlar 4 nəfər, digərləri 128 nəfər idi. Ordubad şəhərində ruslar 179 nəfər, ermənilər 284 nəfər, kürdlər -, yəhudilər -, tatarlar 4.088 nəfər, aysorlar -, digərləri 128 nəfər idi.[7]

---

[1] Yenə orada.
[2] Yenə orada.
[3] Yenə orada.
[4] Первая Всеобщая перепись населения Российской империи, 1897 г. LXXI. Эриванская Губерния. Под. Ред. Н.А. Тройницкого. Типография В.П. Мещарского. 1905, с. 1.
[5] Первая Всеобщая перепись населения Российской империи, 1897 г. LXXI. Эриванская Губерния, с. 2.
[6] Yenə orada, s. 2.
[7] Yenə orada, s. 3.

Dini tərkibə görə, Naxçıvan qəzasında pravaslav məzhəbi 881 nəfər, staroobryadniklər 170 nəfər, roma-katoliklər 171 nəfər, protestantlar 13 nəfər, müsəlmanlar 64.825 nəfər, yəhudilər 36 nəfər, xristianlar (erməni-qriqoryan və erməni-katoliklər) 34.675 nəfər, digərləri -, o cümlədən Naxçıvan şəhərində pravaslav məzhəbi 249 nəfər, staroobryadniklər 16 nəfər, roma-katoliklər 88 nəfər, protestantlar 5 nəfər, müsəlmanlar 6.170 nəfər, yəhudi 1 nəfər, xristianlar (erməni-qriqoryan və erməni-katoliklər) 2.261 nəfər, digərləri -, o cümlədən Ordubad şəhərində pravaslav məzhəbli 181 nəfər, staroobryadniklər 5 nəfər, roma-katoliklər 47 nəfər, protestantlar 3 nəfər, müsəlmanlar 4.091 nəfər, yəhudi 2 nəfər, xristianlar (erməni-qriqoryan və erməni-katoliklər) 282 nəfər, digərləri – idi.[1] Beləliklə, 1897-ci il məlumatları göstərir ki, Naxçıvan qəzasının ümumi əhalisi 100.771 nəfər idi ki, bunun da 8.790 nəfəri Naxçıvan, 4.611 nəfəri Ordubad şəhərinin payına düşürdü.

**1900-1917-ci illərdə Naxçıvan qəzasının əhalisinin say dinamikası və etnik tərkibi**

1897-ci il əhali siyahıyaalınmasından sonra Naxçıvan qəzasının əhalisinin sayı, etnik və cins tərkibi ilə bağlı məlumatlar 1909-cu il 1 yanvar tarixnə aiddir.

1909-cu il 1 yanvar tarixinə olan məlumatlara görə, Naxçıvan qəzasında 4 polis sahəsi, 167 kənd var idi. Naxçıvan qəzasının əhalisi (şəhərsiz) 106.981 nəfər idi ki, bunun da 57.131 nəfəri kişi, 49.850 nəfəri qadın idi.

1909-cu il məlumatlarına görə, Naxçıvan qəzasının 1-ci polis sahəsində 3 kənd cəmiyyəti var idi. Birinci polis sahəsinin Qıvraq kənd cəmiyyətinin tabeliyində 8 kənd var idi. Etnik tərkibinə görə, buranın əhalisinin 6.970 nəfəri (3.664 kişi, 3.306 qadın) tatar, 635 nəfəri (355 kişi, 280 qadın) kürd idi. Birinci polis sahəsinin Tumbul kənd cəmiyyətinə 9 kənd daxil idi. Etnik tərkibinə görə, buranın əhalisinin 6.685 nəfəri erməni (3.462 kişi, 3.223 qadın), 3.709 nəfəri (2.008 kişi, 1.701 qadın) tatar idi. Birinci polis sahəsinin Şıxmahmud kənd cəmiyyətinə 14 kənd daxil idi. Etnik tərkibinə görə, buranın əhalisinin 6.287 nəfəri (3.257 kişi, 3.030 qadın) erməni, 1.310 nəfəri tatar (720 kişi, 590 qadın) idi.[2]Məlumatlardan göründüyü kimi, Naxçıvan qəzasının 1-ci polis sahəsində 3 kənd cəmiyyəti, 31 kənd var idi. Polis sahəsinin ümumi əhalisi 25.596 nəfər idi ki, bunun da 13.466 nəfəri kişi, 12.130 nəfəri qadın idi. Etnik tərkibinə görə, 1-ci polis sahəsində 12.972 nəfərlə ermənilər 1-ci yerdə, 11.989 nəfərlə tatarlar 2-ci yerdə, 635 nəfərlər kürdlər (355 kişi, 280 qadın) 3-cü yerdə gəlirdi.

1909-cu il məlumatlarına görə, Naxçıvan qəzasının 2-ci polis sahəsində 4 kənd cəmiyyəti var idi. İkinci polis sahəsinin Qarababa kənd cəmiyyətinin tabeliyində 28 kənd var idi. Etnik tərkibinə görə, buranın əhalisinin 5.553 nəfəri erməni (2.900 kişi, 2.653 qadın), 7.558 nəfəri (4.065 kişi, 3.493 qadın) tatar idi. İkinci polis sahəsinin Diqin-Almalı kənd cəmiyyətinə 11 kənd daxil idi. Etnik tərkibinə görə, buranın əhalisinin 3.804 nəfəri erməni (1.976 kişi, 1.828 qadın), 2.122 nəfəri (1.175 kişi, 947 qadın) tatar idi. İkinci polis sahəsinin Karmalinov kənd cəmiyyətinin tabeliyində 1 kənd var idi. Etnik tərkibinə görə, kəndin əhalisi ruslar idi. Kənd əhalisinin sayı 285 nəfər (141 kişi, 144 qadın) idi. İkinci polis sahəsinin Cəhri kənd cəmiyyətinin tabeliyində 7 kənd var idi. Etnik tərkibinə görə, buranın əhalisinin 2.993 nəfəri (1.637 kişi, 1.356 qadın), 4.866 nəfəri (2.756 kişi, 2.110 qadın) tatar idi.[3]Məlumatlardan göründüyü kimi, Naxçıvan qəzasının 2-ci polis sahəsində 4 kənd cəmiyyəti, 47 kənd var idi. Polis sahəsinin ümumi əhalisi 27.181 nəfər idi ki, bunun da 14.650 nəfəri kişi, 12.531 nəfəri qadın idi. Etnik tərkibinə görə, 2-ci polis sahəsində 14.546 nəfərlə (7.996 kişi, 6.550 qadın) tatarlar 1-ci yerdə, 12.350 nəfərlə (6.513 kişi, 5.837 qadın) ermənilər 2-ci yerdə, 285 nəfərlə (141 kişi, 144 qadın) ruslar 3-cü yerdə qərarlaşmışdı.

[1] Yenə orada.

[2] Кавказский Календарь на 1910 год. Тифлис, 1909. Ч. 1. Отдел 4. Статистический отдель, с. 519.

[3] Yenə orada.

Naxçıvan qəzasının 3-cü polis sahəsində 3 kənd cəmiyyəti var idi. Qazançı kənd cəmiyyətinin tabeliyində 21 kənd var idi. Etnik tərkibinə görə, buranın əhalisinin 1.328 nəfəri (744 kişi, 584 qadın) erməni, 7.539 nəfəri tatar (4.196 kişi, 3.343 qadın) idi. Üçüncü polis sahəsinin Abrakunis kənd cəmiyyətinin tabeliyində 13 kənd var idi. Etnik tərkibinə görə, buranın əhalisinin 3.211 nəfəri erməni (1.721 kişi, 1.490 qadın), 5.197 nəfəri tatar (2.845 kişi, 2.352 qadın) idi. Nehrəm kənd cəmiyyətinin tabeliyində 3 kənd var idi. Etnik tərkibinə görə, buranın əhalisinin 3.529 nəfəri (1.823 kişi, 1.706 qadın) erməni, 4.028 nəfəri (2.066 kişi, 1.962 qadın) tatar idi.[1]Məlumatlardan göründüyü kimi, Naxçıvan qəzasının 3-cü polis sahəsində 37 kənd var idi. Üçüncü polis sahəsinin əhalisi 24.832 nəfər idi ki, bunun da 13.395 nəfəri kişi, 11.437 nəfəri qadın idi. Etnik tərkibinə görə, 3-cü polis sahəsində 16.764 nəfərlə (9.107 kişi, 7.657 qadın) tatarlar 1-ci yerdə, 8.068 nəfərlə (4.288 kişi, 3.780 qadın) ermənilər 2-ci yerdə idi.

Naxçıvan qəzasının 4-cü polis sahəsində 4 kənd cəmiyyəti var idi. Dördüncü polis sahəsinin Yuxarı Əylis kənd cəmiyyətinə 14 kənd daxil idi. Etnik tərkibinə görə, buranın əhalisinin 4.778 nəfəri (2.490 kişi, 2.288 qadın) erməni, 2.745 nəfəri (1.471 kişi, 1.274 qadın) tatar idi. Dördüncü polis sahəsinin Yuxarı Azin kənd cəmiyyətinin tabeliyində 12 kənd var idi. Etnik tərkibinə görə, buranın əhalisinin 2.639 nəfəri (1.364 kişi, 1.275 qadın) erməni, 3.731 nəfəri (1.949 kişi, 1.782 qadın) tatar idi. Dördüncü polis sahəsinin Çananab kənd cəmiyyətinin tabeliyində 12 kənd var idi. Etnik tərkibinə görə, buranın əhalisinin 3.405 nəfəri (1.771 kişi, 1634 qadın) erməni, 5.160 nəfəri (2.753 kişi, 2.407 qadın) tatar idi. Vənənd kənd cəmiyyətinə 14 kənd daxil idi. Etnik tərkibinə görə, buranın əhalisinin 1.325 nəfəri (731 kişi, 594 qadın) erməni, 5.589 nəfəri (3.091 kişi, 2.498 qadın) tatar idi.[2]Məlumatlardan göründüyü kimi, Naxçıvan qəzasının 4-cü polis sahəsində 52 kənd var idi. Polis sahəsinin əhalisi 29.372 nəfər idi ki, bunun da 15.620 nəfəri kişi, 13.752 nəfəri qadın idi. Etnik tərkibinə görə, 4-cü polis sahəsində 17.225 nəfərlə (9.264 kişi, 7.961 qadın) tatarlar 1-ci yerdə, 12.147 nəfərlə (6.356 kişi, 5.791 qadın) ermənilər 2-ci yerdə idi.

Beləliklə, Naxçıvan qəzasının əhalisinin say, cins, etnik tərkibi ilə bağlı 1909-cu il 1 yanvar tarixinə olan məlumatlardan aydın olur ki, qəzada 167 kənd var idi. Qəza əhalisinin ümumi sayı (şəhərlərsiz) 106.981 nəfər idi ki, bunun da 57.131 nəfəri kişi, 49.850 nəfəri qadın idi. Etnik tərkibinə görə, Naxçıvan qəzasında 60.524 nəfərlə (32.759 kişi, 27.765 qadın) tatarlar 1-ci yerdə, 45.537 nəfərlə (23.876 kişi, 21.661 qadın) ermənilər 2-ci yerdə, 635 nəfərlə (355 kişi, 280 qadın) kürdlər 3-cü yerdə, 285 nəfərlə (141 kişi, 144 qadın) ruslar 4-cü yerdə gəlirdi.

1910-cu il məlumatlarına görə, Naxçıvan qəzasının əhalisi 125.846 nəfər (67.174 kişi, 58.672 qadın) idi ki, bunun da 10.277 nəfəri (5.463 kişi, 4.814 qadın) Naxçıvan şəhərinin, 5.384 nəfəri (2.868 kişi, 2.516 qadın) Ordubad şəhərinin, 26.362 nəfəri (13.869 kişi, 12.493 qadın) qəzanın 1-ci polis sahəsinin, 27.995 nəfəri (15.089 kişi, 12.906 qadın) 2-ci polis sahəsinin, 25.576 nəfəri (13.797 kişi, 11.779 qadın) 3-cü polis sahəsinin, 30.252 nəfəri isə (16.088 kişi, 14.164 qadın) 4-cü polis sahəsinin payına düşürdü. Qəzada 14 kənd cəmiyyəti, 167 kənd var idi.[3]

1914-cü il məlumatlarına görə, Naxçıvan qəzasının əhalisi 136.174 nəfər (73.769 kişi, 62.405 qadın) idi ki, bunun da 8.945 nəfəri (4.556 kişi, 4.389 qadın) Naxçıvan şəhəri, 5.655 nəfəri (3.384 kişi, 2.271 qadın) Ordubad şəhəri, 121.574 nəfəri (65.829 kişi, 55.745 qadın) isə Naxçıvan qəzasının digər bölgələrinin payına düşürdü. Etnik tərkibinə görə, Naxçıvan qəzasında ruslar 842 nəfər (436 kişi, 266 qadın, pravaslav, 78 kişi, 62 qadın sektant), 95 nəfər

[1] Yenə orada.
[2] Yenə orada, s. 519-520.
[3] Кавказский Календарь на 1912 год. Тифлис, 1911. Отдел 4. Статистический отдель, с. 244.

(54 kişi, 41 qadın) polyak, alman və d., 205 nəfəri (151 kişi, 54 qadın) kartvel, 53.684 nəfər erməni-qriqoryan (28.526 kişi, 25.158 qadın), 9 nəfər (9 kişi) Qafqaz-dağlı, 500 nəfər kürd-müsəlman (247 kişi, 253 qadın), 13 nəfər (9 kişi, 4 qadın) Asiyalı-xristian, 80.826 nəfər tatar-şiə (44.259 kişi, 36.567 qadın) idi.[1] Etnik tərkibinə görə, Naxçıvan şəhərinin 192 nəfəri rus (105 kişi, o cümlədən 11 daimi, 94 nəfər müvəqqəti yaşayanlar, 80 qadın, o cümlədən 8 daimi, 72 müvəqqəti yaşayanlar, pravaslav; 2 ki, 5 qadın, müvəqqəti, sektant), 21 nəfəri polyak, alman və d. (11 kişi, 10 qadın, müvəqqəti yaşayanlar), 86 nəfəri kartvel (56 kişi, 30 qadın, müvəqqəti yaşayanlar), 2.638 nəfəri erməni-qriqoryan (1.399 kişi, o cümlədən 1.275 daimi, 124 müvəqqəti yaşayanlar, 1.239 qadın, o cümlədən 1.158 daimi, 81 nəfər müvəqqəti yaşayanlar), 9 nəfəri (kişi, müvəqqəti) dağlı-Qafqaz, 13 nəfəri Asiyalı-xristian (9 kişi, 4 qadın, müvəqqəti yaşayanlar), 5.986 nəfəri (2.965 kişi, o cümlədən 2.878 daimi, 87 müvəqqəti yaşayanlar, 3.021 qadın, o cümlədən 2.981 daimi, 40 nəfər müvəqqəti yaşayanlar) tatar-şiə idi. Etnik tərkibinə görə, Ordubad şəhərinin 112 nəfəri rus (63 kişi, 49 qadın, pravaslav, müvəqqəti yaşayanlar), 3 nəfəri polyak, alman və d. (1 kişi, 2 qadın, müvəqqəti yaşayanlar), 173 nəfəri (77 kişi, o cümlədən 68 daimi, 9 müvəqqəti, 96 qadın, o cümlədən 84 daimi, 12 müvəqqəti yaşayanlar) erməni-qriqoryan, 5.367 nəfəri (3.243 kişi, o cümlədən 3.230 daimi, 13 nəfər müvəqqəti yaşayanlar, 2.124 qadın, o cümlədən 2.116 daimi, 8 müvəqqəti yaşayanlar) tatar-şiə idi.[2]

1916-cı il 1 yanvar məlumatlarına görə, Naxçıvan qəzasının əhalisi 136.859 idi ki, bunun da 8.934 nəfəri Naxçıvan şəhərinin (4.541 kişi, 4.393 qadın), 5.717 nəfəri Ordubad şəhərinin (3.423 kişi, 2.294 qadın), 122.208 nəfəri isə (66.117 kişi, 56.091 qadın) Naxçıvan qəzasının digər bölgələrinin payına düşürdü.[3] Naxçıvan şəhərinin 8.934 nəfər əhalisinin 8.477 nəfəri (4.255 kişi, 4.222 qadın) daimi, 457 nəfəri (286 kişi, 171 qadın) müvəqqəti yaşayanlar idi. Ordubad şəhərinin 5.717 nəfər əhalisinin 5.594 nəfəri (3.353 kişi, 2.241 qadın) daimi, 123 nəfəri (70 kişi, 53 qadın) müvəqqəti yaşayanlar idi. Naxçıvan qəzasının digər bölgələrinin 122.208 nəfər əhalisinin 119.272 nəfəri (64.221 kişi, 55.051 qadın) daimi, 2.936 nəfəri (1.896 kişi, 1.040 qadın) müvəqqəti yaşayanlar idi. Etnik tərkibinə görə, Naxçıvan şəhərinin əhalisinin 147 nəfəri rus (82 kişi, o cümlədən 10 daimi, 72 müvəqqəti yaşayanlar, 60 qadın, o cümlədən 7 daimi, 53 müvəqqəti yaşayanlar, pravaslav, 2 kişi, 3 qadın sektant, müvəqqəti yaşayanlar), 11 nəfəri digər Avropa xalqları (7 kişi, 4 qadın, müvəqqəti yaşayanlar), 72 nəfəri kartvel (49 kişi, 23 qadın, müvəqqəti yaşayanlar), 2.665 nəfəri erməni-qriqoryan (1.399 kişi, o cümlədən 1.317 daimi, 82 müvəqqəti, 1.266 qadın, o cümlədən 1.203 daimi, 63 müvəqqəti), 6 nəfəri (kişi, müvəqqəti) Qafqaz-dağlı, 7 nəfəri (5 kişi, 2 qadın, müvəqqəti), xristian-Asiyalı, 6.026 nəfəri tatar-şiə (2.991 kişi, o cümlədən 2.928 daimi, 63 müvəqqəti, 3.035 qadın, o cümlədən 3.012 daimi, 23 müvəqqəti) idi. Etnik tərkibinə görə, Ordubad şəhərinin əhalisinin 86 nəfəri rus (51 kişi, 35 qadın, müvəqqəti), 3 nəfəri (1 kişi, 2 qadın, müvəqqəti) digər Avropa xalqları, 179 nəfəri erməni-qriqoryan (82 kişi, o cümlədən 75 daimi, 7 müvəqqəti, 97 qadın, o cümlədən 88 daimi, 9 müvəqqəti), 5.449 nəfəri (3.289 kişi, o cümlədən 3.278 daimi, 11 müvəqqəti, 2.160 qadın, o cümlədən 2.153 daimi, 7 müvəqqəti) tatar-şiə idi. Etnik tərkibinə görə, Naxçıvan qəzasının digər ərazilərinin 471 nəfəri rus (234 kişi, o cümlədən 6 daimi, 228 müvəqqəti, 114 qadın, o cümlədən 5 daimi, 109 müvəqqəti, pravaslav; 70 kişi, o cümlədən 64 daimi, 6 müvəqqəti, 53 qadın, daimi sektant), 43 nəfəri digər Avropa xalqları (29 kişi, 14 qadın, müvəqqəti), 96 nəfəri kartvel-pravaslav (78 kişi, 18 qadın, müvəqqəti yaşayanlar), 51.365 (qeyd: Azərbaycan Respublikası Dövlət Arxivinin sənədlərində bu rəqəm 50.193 nəfər

[1] Кавказский Календарь на 1915 год. Тифлис, 1914. Отдель Статистический, с. 250-252.
[2] Yenə orada, s. 250-253.
[3] Кавказский Календарь на 1917 год. Тифлис, 1916. Отдель Статистический, с. 220-221.

göstərilir[1]) nəfəri erməni-qriqoryan (27.274 kişi, o cümlədən 26.599 daimi, 675 müvəqqəti, 24.091 qadın, o cümlədən 23.666 daimi, 425 müvəqqəti yaşayanlar), 517 nəfəri kürd-müsəlman (254 kişi, 263 qadın, daimi), 69.716 nəfəri tatar-şiə (38.178 kişi, o cümlədən 37.298 daimi, 880 müvəqqəti, 31.538 qadın, o cümlədən 31.064 daimi, 474 müvəqqəti yaşayanlar) idi.[2](Məlumat üçün onu da qeyd edək ki, Azərbaycan Respublikası Dövlət Arxivinin sənədlərinə əsasən, Naxçıvan qəzasının 1-ci polis sahəsinin əhalisi 41.586 nəfər (25.820 nəfər azərbaycanlı, 15.766 nəfər erməni), 2-ci polis sahəsinin əhalisi 26.636 nəfər (16.957 nəfər azərbaycanlı, 9.679 nəfər erməni), 3-cü polis sahəsinin əhalisi 29.965 nəfər (19.035 nəfər azərbaycanlı, 10.930 nəfər erməni), 4-cü polis sahəsinin əhalisi 35.782 nəfər (21.964 nəfər azərbaycanlı, 13.818 nəfər erməni) idi.[3])

**Nəticə**

Beləliklə, Naxçıvan qəzasının əhalisinin sayı, cins və etnik tərkibi ilə bağlı məlumatlar göstərir ki, 1853-cü ildə Naxçıvan qəzasının əhalisi 25.000 nəfər, 1873-cü ildə 69.124 nəfər, 1886-cı ildə 84.020 nəfər, 1897-ci il əhali siyahıyaalınmasına görə 100.771 nəfər, 1909-cu il 1 yanvar tarixinə olan məlumatlara görə, qəza əhalisinin ümumi sayı (şəhərlərsiz) 106.981 nəfər, 1910-cu il məlumatlarına görə, Naxçıvan qəzasının əhalisi 125.846 nəfər, 1914-cü il məlumatlarına görə, Naxçıvan qəzasının əhalisi 136.174 nəfər, 1916-cı il 1 yanvar məlumatlarına görə, Naxçıvan qəzasının əhalisi 136.859 nəfər olmuşdu. Naxçıvan xanlığı ləğv olunduqdan sonrakı dövrdə, 1849-cu ildə yaradılmış İrəvan quberniyasında qəza statusu daşıyan Naxçıvan qəzasına dövr ərzində qonşu dövlətlərdən köçürülmələrə baxmayaraq, yerli xalq, Azərbaycan türkləri yenə də qəzada say üstünlüyünü qoruyub saxlaya bilmişdi. Faiz nisbətinə görə, Naxçıvan qəzasında Azərbaycan türkləri 72,3%-lə birinci, ermənilər 27,1%-lə ikinci, digər millətlər isə sonrakı yerdə qərarlaşmışdı.

[1] Azərbaycan Respublikası Dövlət Arxivi (ARDA), f. 970, siy. 1, sax. vah. 233, v. 31.
[2] Кавказский Календарь на 1917 год. Тифлис, 1916. Отдель Статистический, с. 214-221.
[3] Azərbaycan Respublikası Dövlət Arxivi (ARDA), f. 970, siy. 1, sax. vah. 253, v. 7.

## ƏDƏBİYYAT SİYAHISI
## *(References)*


1. Azərbaycan Respublikası Dövlət Arxivi (ARDA), f. 970, siy. 1, sax. vah. 233, v. 31.
2. Azərbaycan Respublikası Dövlət Arxivi (ARDA), f. 970, siy. 1, sax. vah. 253, v. 7.
3. Военно-статистическое обозрение Российской империи. 1837-1854. Том 16. Кавказский край. Эриванская губерния. СПб. 1853.
4. Кавказский Календарь на 1910 год. Тифлис: Типография Канцелярия Главноначальствующого гражданскою частью на Кавказ, Ч. 1, 1909.
5. Кавказский Календарь на 1912 год. Тифлис: Типография Канцелярия Главноначальствующого гражданскою частью на Кавказ, 1911.
6. Кавказский Календарь на 1915 год. Отдель Статистический. Тифлис: Типография Канцелярия Главноначальствующого гражданскою частью на Кавказ, 1914.
7. Кавказский Календарь на 1917 год. Отдель Статистический. Тифлис: Типография Канцелярия Главноначальствующого гражданскою частью на Кавказ, 1916.
8. Первая Всеобщая перепись населения Российской империи, 1897 г. LXXI. Эриванская Губерния. Под. Ред. Н. А. Тройницкого. Типография В.П. Мещарского. 1905.
9. Сборник сведений о Кавказе. Т. 5. Списки населенныхь месть Кавказского Края. Ч. 1. Губернии Эриванская, Кутаисская, Бакинская, Ставропольская и Терская область. Под. ред. Главного ред. Кавказского Статистического Комитета Н.Зейдлица. Тифлис: Типография Управления Наместника Кавказского, 1879.
10. Свод Статистических данных о населении Закавказского края, извлеченных из посемейных списков 1886 г. Тифлис: Типография И.Мартиросианца, Орбел ул. Д. 1., 1893.